***AZƏRBAYCAN RESPUBLİKASI MİLLİ MƏCLİSİNİN SƏHİYYƏ KOMİTƏSİNİN SƏDRİ, SSRİ DÖVLƏT MÜKAFATI LAUREATI, SSRİ TİBB ELMLƏRİ AKADEMİYASININ AKADEMİK N.N. PETROV ADINA MÜKAFATI LAUREATI, AZƏRBAYCAN MİLLİ ELMLƏR AKADEMİYASININ, RUSİYA TİBB ELMLƏRİ AKADEMİYASININ, RUSİYA TƏBİƏT ELMLƏRİ AKADEMİYASI VƏ POLŞA TİBB ELMLƏRİ AKADEMİYASININ HƏQİQİ ÜZVÜ, ÜMUMDÜNYA ONKOLOQLAR VƏ ORTOPED - TRAVMATOLOQLAR ASSOSİASİYASININ, ÜMUMDÜNYA TİBB AKADEMİYASININ, AVROPA BƏRPA CƏRRAHLIĞI ASSOSİASİYASININ, AMERİKA KLİNİK ONKOLOGİYA CƏMİYYƏTİNİN ÜZVÜ, MİLLİ MƏCLİSİN DEPUTATI, AMEA-NIN BİOLOGİYA VƏ TİBB ELMLƏRİ BÖLMƏSİNİN AKADEMİK-KATİBİ, ƏMƏKDAR ELM XADİMİ, TİBB ELMLƏRİ DOKTORU, AKADEMİK ƏHLİMAN TAPDIQ OĞLU ƏMİRASLANOV HAQQINDA***

# *BİOQRAFİK MƏLUMAT*

Əmiraslanov Əhliman Tapdıq oğlu 1947 – ci il noyabrın 17 – də Qərbi Azərbaycanın Göyçə Mahalının Basarkeçər rayonunun Zod kəndində ziyalı ailəsində anadan olub. Atası Əmiraslanov Tapdıq Muxtar oğlu (1918 – 1976) orta məktəb direktoru, Basarkeçər rayonunun partiya rəhbəri, həmin rayonun maarif şöbə müdiri vəzifələrində çalışıb, bütün qüvvə və bacarığını elin savadlanmasına, maariflənməsinə sərf edib, uzunmüddətli qüsursuz pedaqoji fəaliyyətinə görə «Əməkdar müəllim» fəxri adına layiq görülüb. Anası Əliyeva Xanım İlyas qızı 1922 – ci ildə Zod kəndində anadan olub, 2006 – cı ildə vəfat edib.

Ə.T.Əmiraslanov 1965 – ci ildə orta məktəbi qızıl medalla bitirərək elə həmin ildə N.Nərimanov adına Azərbaycan Dövlət Tibb İnstitutunun müalicə – profilaktika fakültəsinə daxil olub. İnstitutda təhsil alarkən fitri istetadı, yüksək erudisiyası ilə fərqlənən gənc Ə.T.Əmiraslanov onkologiya sahəsinə daha çox meyl göstərib və 1969 – cu ildə, hələ tələbə ikən, Bakı şəhər kliniki onkologiya xəstəxanasında tibb qardaşı vəzifəsində əmək fəaliyyətinə başlayıb.

O, 1971– ci ildə institutu fərqlənmə diplomu ilə bitirdikdən sonra, 1971– 74 –cü illərdə Bakı şəhər kliniki onkologiya xəstəxanasının cərrahiyyə şöbəsində həkim-ordinator və şöbənin müdiri vəzifələrində çalışıb. Onun onkologiya üzrə ilk müəllimi professor Arif Abbasov olub.

Ə.T.Əmiraslanov 1974 – cü il oktyabrın 1 – də müvəffəqiyyətlə imtahan verərək, Moskva şəhərində SSRİ Tibb Elmləri Akademiyasının (TEA) Ümumittifaq Onkoloji Elmi Mərkəzi (ÜOEM) nəzdində aspiranturaya daxil olub. 1977 – ci ildə

aspiranturada təhsil vaxtı hələ başa çatmamış, vaxtından əvvəl, «Bədxassəli şişlərlə əlaqədar aşağı ətrafların amputasiyasından sonra xəstələrin reabilitasiyası» mövzusunda namizədlik dissertasiyası müdafiə edib və tibb elmləri namizədi elmi dərəcəsinə layiq görülüb.

Adətən, keçmiş Sovetlər İttifaqı dövründə periferik respublikalardan Moskvanın təhsil və elm mərkəzlərində aspiranturanı bitirən mütəxəssislər dissertasiya müdafiə edib elmi dərəcə aldıqdan dərhal sonra öz respublikalarına qayıtmalı idilər, lakin Ə.T.Əmiraslanov ÜOEM-in baş direktoru akademik N.N.Bloxinin və onun elmi rəhbəri akademik N.N.Trapeznikovun təkidli təklifi ilə gənc Azərbaycan alimi həmin mərkəzdə saxlanılıb. Beləliklə, Ə.T.Əmiraslanov 24 noyabr 1977 – ci ildən Moskvada (aspiranturanı bitirdikdən sonra) SSRİ TEA – nın ÜOEM – inin ümumi onkologiya şöbəsində kiçik elmi işçi, 16 sentyabr 1981- ci ildən həmin şöbədə baş elmi işçi, 1984 – cü ildən böyük elmi işçi vəzifələrində çalışıb. Bu dövrlərdə çoxlu miqdarda mürəkkəb cərrahiyyə əməliyyatları, o cümlədən dünyanın yalnız bir neçə məşhur klinikalarında icra olunan və SSRİ miqyasında ilk dəfə Azərbaycan alimi Ə.T.Əmiraslanov tərəfindən həyata keçirilən «Rotasion plastika» operasiyası böyük məharətlə yerinə yetirilib və ümidverici göstəricilər əldə edilib. Gənc alim elmi axtarışlarını uğurla davam etdirərək 1984 – cü ildə, 36 yaşında ikən, «Osteogen sarkomalı xəstələrin kompleks müalicə üsulları» mövzusunda doktorluq dissertasiyası müdafiə edib və tibb elmləri doktoru elmi dərəcəsinə layiq görülüb.

Sümük sarkomasının bütün incəliklərini dünya mətbuatında geniş şərh edən və Beynəlxalq elmi yığıncaqlarda sanballı çıxışları ilə fərqlənən alimin adı, tezliklə, nəinki keçmiş Sovetlər İttifaqının ayrı – ayrı respublikalarında, eləcə də dünyanın hər yerində tanınır və şöhrətlənir.

Ə.T.Əmiraslanov 1979 – 1985 – ci illər ərzində Moskvada apardığı səmərəli elmi – tədqiqat işlərinə görə ardıcıl olaraq SSRİ TEA-nın ÜOEM-inin rəhbərliyi tərəfindən müxtəlif mükafatlara layiq görülüb. Həmin illər ərzində ümumi onkologiya şöbəsində «Sümük şişlərinin müalicə metodlarının təkmilləşdirilməsi» mövzusu üzrə cavabdehlik görkəmli alim Ə.T. Əmiraslanova tapşırılıb və o, bu vəzifənin öhdəsindən bacarıqla gəlib. Dünya şöhrətli mütəxəssislərdən olan akademik N.N.Trapeznikov qeyd edirdi ki, «Əhliman Əmiraslanov Moskvada işləyərkən onun mövzu ətrafında əldə etdiyi nəticələrin böyük əksəriyyəti SSRİ –də ilk dəfə əldə edilən son dərəcə dəyərli yeni elmi nəticələr idi və həmin nəticələr xarici ölkə alimlərinin bu sahədəki elmi nəticələrini ya qabaqlayır, ya da onları tamamlayırdı»

O, ardıcıl olaraq bir neçə elmi işləmələri müvəffəqiyyətlə səhiyyə praktikasına tətbiq edib. Belə işləmələr sırasında dayaq – hərəkət aparatı şişləri zamanı bərpa müalicəsi metodları əsas yer tutur.

Azərbaycan alimi iyirminci yüzilliyin 70 – 80 – cı illərində «Dayaq – hərəkət aparatı şişləri olan xəstələrin reabilitasiyası və müalicəsi» üzrə Ümumittifaq Məktəbinə rəhbərlik edib və dəfələrlə SSRİ Xalq Təsərrüfatı Nailiyyətləri Sərgisinin qızıl medalları ilə təltif edilib.

Ə.T.Əmiraslanovun «Uşaq, yeniyetmə və yaşlılarda osteogen sarkomanın kompleks müalicə metodu» adlı işləməsi SSRİ Səhiyyə Nazirinin 1162 saylı əmri ilə 1983 – cü il 3 oktyabr tarixində tibb elminin səhiyyə praktikasında qazanılan mühüm nailiyyətlərin tətbiqinin Ümumittifaq perspektiv planına daxil edilib.

1985 – ci ildə Ə.T.Əmiraslanovun məhsuldar fəaliyyəti «Sümük sarkomaları» adlı monoqrafiyada öz əksini tapıb və bu orijinal monoqrafiyaya görə o, SSRİ Tibb Elmləri Akademiyasının 5 ildə bir dəfə təqdim edilən «akademik N.N.Petrov adına» mükafatı və medalı ilə təltif edilib.

Dünyada tanınan və layiqli nüfuz qazanan alim 1986 – cı ildə elm və texnika sahəsi üzrə «Onkoloji xəstələrin bərpa müalicəsi metodlarının işlənib hazırlanması və onların kliniki təcrübədə tətbiqi» haqqındakı silsilə elmi – texnoloji işlərinə görə SSRİ Dövlət Mükafatı laureatına layiq görülüb.

1987 – ci il iyunun 18 – də Ə.T.Əmiraslanov ÜOEM – in ümumi onkologiya şöbəsində aparıcı elmi işçi vəzifəsinə təsdiq edilib. 1989- cu ildə həmin şöbədə professor vəzifəsinə seçilib və 1992 – ci il iyulun 31 – nə qədər həmin vəzifədə çalışıb.

Akademik Ə.T.Əmiraslanov Rusiya Tibb Elmləri Akademiyasının Onkoloji Elmi Mərkəzində praktiki işlə bərabər böyük elmi – təşkilati işlərlə də məşğul olub. O, həmin illərdə «Onkologiya» ixtisası üzrə İxtisaslaşdırılmış elmi şuranın, həmçinin Rusiya Tibb Elmləri Akademiyasının (RTEA) Onkoloji Elmi Mərkəzinin elmi şurasının, SSRİ TEA – nın ÜOEM – ində təşkil edilmiş hospitalizasiya üzrə daimi komissiyanın üzvü olub. 1988 – ci ildə SSRİ TEA- nın ÜOEM – də keçirilən «Sümük sarkomlarının müalicəsi» adlı Onkoloqlar Məktəbinin Beynəlxalq Təşkilat Komitəsi tərkibində aktiv fəaliyyət göstərib.

Moskvada işlədiyi müddətdə 12 tibb elmləri namizədi və 5 tibb elmləri doktorunun yetişməsinə bilavasitə rəhbərlik edib.

Akademik Ə.T.Əmiraslanov 1991 – ci ildə yüksək ixtisaslı tibb kadrları hazırlığındakı, eləcə də tibb elminin və səhiyyənin inkişafındakı xidmətlərinə görə «Əməkdar elm xadimi» fəxri adına layiq görülüb.

Keçən əsrin 80-ci illərinin sonu, 90 – cı illərinin əvvəlləri Azərbaycan üçün çox çətin, ağır illər idi. Bu illərdə digər sahələrdə olduğu kimi tibb sahəsindən də olan bir çox mütəxəssislər Azərbaycanı tərk edib başqa ölkələrə gedirdilər. Azərbaycanda beyin axınının gücləndiyi bir dövrdə Əhliman Əmiraslanov Moskvadakı rahat iş yerindən çıxıb Bakıya gəlməyi və Azərbaycanın ağır illərində ona öz peşəkar həkimliyi ilə dayaq olmağı qərarlaşdırdı. O, öz xeyirxahlığı, təmənnasız xidməti ilə tezliklə əhalinin hörmət və məhəbbətini qazandı. Alim öz doğma xalqına xidmət etməkdən, çətin günlərdə öz xalqının arasında olmaqdan məmnunluq duyurdu. Əhliman Əmiraslanov bu ünsiyyəti, bu münasibəti indi də davam etdirir. O, hansı ictimai işlərdə dövlət vəzifələrində çalışsa da həkimlik peşəsinin ritmini heç vaxt nə dəyişmir, nə də pozmur, hər gün səhərlər öz həkimlik peşəsi ilə məşğul olmağa üstünlük verir. Xəstələrə şəfa verməklə, günü xoş əhvalla davam etdirir. Ona görə də xalq onu təkcə dünya şöhrətli alim, bacarıqlı təşkilatçı, səriştəli təhsil və səhiyyə işçisi kimi deyil, həm də qayğıkeş və ünsiyyətli bir həkim kimi tanıyır və sevir. Əhliman Əmiraslanov xalqına, vətəninə xidmət etməyi özünə övladlıq borcu hesab edir.

O, 23 il Azərbaycan Tibb Universitetinin rektoru vəzifəsində çalışıb və hazırda Azərbaycan Milli Məclisinin Səhiyyə Komitəsinin sədri, AMEA-nın Biologiya və Tibb Bölməsinin akademik-katibidir. Məhz onun rektorluğu dövründə Azərbaycan Tibb Universitetində bir sıra mühüm islahatlar həyata keçirilmiş və yüksək ixtisaslı həkim kadrlarının hazırlığı işi xeyli təkmilləşdirilmiş, universitet Boloniya sisteminə qoşulmuş və tədrisin kredit sistemi tətbiq edilmiş, universitetin onkoloji, stomatoloji, tədris-terapevtik və tədris-cərrahlıq klinikaları yaradılmış, universitetin Beynəlxalq statusu xeyli artmışdır.

Ə.T.Əmiraslanov eyni zamanda 1993 – cü il martın 23 – də müsabiqə yolu ilə Azərbaycan Tibb Universitetinin onkologiya kafedrasının müdiri vəzifəsinə seçilib və hazırda da həmin vəzifəni, eyni zamanda ATU-nun onkoloji klinikasının direktoru vəzifəsini yerinə yetirir.

Akademik Ə.T.Əmiraslanovun elmi-tədqiqat işlərinin əsas istiqamətini dayaq – hərəkət aparatı, yumşaq toxumalar, süd vəzisi və bir sıra daxili orqanların, həmçinin digər vəzilərin bədxassəli şişlərinin öyrənilməsi, eləcə də onların effektli müalicə metodlarının və profilaktik tədbirlərinin işlənib hazırlanması və təkmilləşdirilməsi, bu metodların təcrübədə uğurla tətbiq edilməsi təşkil edir. Akademik Ə.T.Əmiraslanovun elmi-tədqiqatlarında aşağıdakı mövzular prioritetlik təşkil edir: dayaq-hərəkət aparatı orqanlarının bədxassəli şişlərinə görə cərrahi müdaxilə edilmiş xəstələrin bərpaedici müalicəsi (reabilitasiyası); sümük və yumşaq toxuma sarkomalarının kombinəedilmiş və kompleks müalicə üsullarının işlənib hazırlanması; sümüklərin bədxassəli şişləri

zamanı hormonal-metabolik dəyişikliklər; Azərbaycanda bəzi bədxassəli şişlərin epidemiologiyası; bədxassəli şişlərin erkən diaqnostikası və proqnozunda parakrin və immunohumoral faktorların klinik əhəmiyyəti; müxtəlif lokalizasiyalı bədxassəli şişlər zamanı angiogenezin xüsusiyyətləri. Onun rəhbərlik etdiyi Onkoloji klinikada texniki cəhətdən mürəkkəb olan bud, qamış və bazu sümüklərinin bədxassəli şişlərində aparılan diz, bud-çanaq və bazu oynaqlarının rezeksiyası və endoprotezləşdirilməsi, qalça-qarınarası ayırma, kürək-döşarası amputasiya kimi cərrahiyyələr müvəffəqiyyətlə yerinə yetirilir. Dayaq-hərəkət aparatı orqanlarının bədxassəli şişlərinə görə cərrahi müdaxilə edilmiş xəstələrin bərpaedici müalicəsi (reabilitasiyası); sümük sarkoması şişlərinin müalicəsində yeni üsulların işlənib hazırlanması; sümüklərin bədxassəli şişlərinin proqnozu; qadın cinsiyyət orqanlarının və sümüklərin bədxassəli şişlərində hormonal-metodik dəyişikliklər; yumşaq toxuma sarkomalarının kombinasiyalı və kompleks şəkildə müasir müalicə üsullarının işlənib hazırlanması; Azərbaycanda bəzi bədxassəli şişlərin epidemiologiyası; bədxassəli şişlərin erkən diaqnostikası və proqnozunda parakrin və immunohumoral faktorların klinik əhəmiyyəti, müxtəlif lokalizasiyalı bədxassəli şişlər zamanı angiogenezin xüsusiyyətləri mövzuları və bu istiqamətli digər mövzular elmi prioritetlik təşkil edir. Alimin bu sahədə təklif etdiyi yeni müalicə metodları artıq sınaqdan çıxaraq praktiki səhiyyədə müvəffəqiyyətlə tətbiq olunur, hazırda ondan müxtəlif klinikalarda geniş miqyasda istifadə edilir. Təklif olunan belə müasir müalicə metodları xəstəliyin uzaq nəticələrini yaxşılışdırır, əlillik dərəcəsini azaldır, qısa müddətdə xəstələrin aktiv əməyə və məişətə qayıtmalarına kömək edir.

Akademik Ə.T.Əmiraslanovun elmi işləri nəinki ölkəmizdə və yaxın xaric sayılan MDB ölkələrində, eləcə də dünyanın digər qabaqcıl ölkələrində geniş yayılıb və onkologiya elmində yeni mərhələnin başlanmasına əsaslı zəmin yaradıb. O, dəfələrlə Amerika Birləşmiş Ştatlarında, Fransada, Yaponiyada, İtaliyada, İsveçdə, Yunanıstanda, Macarıstanda, Bolqarıstanda, Çexiyada, Almaniyada, Sinqapurda, Türkiyədə, Rusiya Federasiyasında, Polşada, İsraildə, Pakistanda, Kanadada, İranda, Avstriyada və digər ölkələrdə keçirilən qurultay, simozium, konqress və konfranslarda elmi məruzələrlə çıxışlar edib, onkologiya sahəsində əldə etdiyi yenilikləri beynəlxalq miqyasda böyük müvəffəqiyyətlə nümayiş etdirib.

Görkəmli alim SSRİ dövründə sovet nümayəndə heyətinin, hazırda isə müstəqil ölkəmizin nümayəndə heyətinin rəhbəri kimi dəfələrlə bir çox xarici ölkələrdə elmi ezamiyyətlərdə olub, xarici ölkələrlə elmi və pedaqoji əlaqələrin möhkəmlənməsi yolunda təqdirəlayiq işlər görüb. Hazırda dünyanın ən məşhur onkoloq – cərrahlarından biri kimi tanınan akademik Ə.T.Əmiraslanov bir çox nüfuzlu xarici

klinikalarda dərinməzmunlu və dəyərli mühazirələr oxuyub, Azərbaycana layiqli başucalığı gətirir. O, həmçinin bir neçə dəfə ABŞ – da Hyüston Tibb Mərkəzindəki M.D.Anderson Onkologiya Klinikasında uzunmüddətli elmi ezamiyyətdə olub.

Akademik Ə.T.Əmiraslanov həm Moskvada fəaliyyət göstərdiyi vaxtlar SSRİ TEA-nın ÜOEM – ində, həm də hazırda Bakıda ATU-nun Onkoloji Klinikasında səmərəli praktiki işlər apararaq, çoxlu miqdarda xəstə qəbul edir, məsləhətlər verir və bilavasitə özü mürəkkəb cərrahi əməliyyatları yerinə yetirir.

O, Moskvada Mərkəzi Təkmilləşdirmə İnstitutunun kursantlarına, SSRİ TEA–nın ÜOEM–nin aspirant və ordinatorlarına, Bakıda isə Azərbaycan Tibb Universitetinin tələbələrinə, rezidentlərə, dinləyicilərə ixtisası üzrə maraqlı və məzmunlu mühazirələr oxuyaraq təcrübəli pedaqoq kimi dərin hörmət və böyük nüfuz qazanıb. Alim 1997 – ci ilin noyabr ayının 19 – da Azərbaycan Respublikasının və xarici ölkələrin tibb alimləri, səhiyyə işçiləri qarşısında «Dayaq – hərəkət aparatının bədxassəli şişlərinin müasir müalicə metodlarının işlənib hazırlanması və təcrübəyə tətbiqi» mövzusu üzrə Akt nitqi söyləyib və həmin nitqin elmi məziyyətləri, müddəaları tibb ictimaiyyətinin böyük marağına səbəb olub. Akademik Ə.T.Əmiraslanov az vaxt ərzində ATU-nun tibb təhsili sistemində bir sıra islahatlar həyata keçirib, kadr hazırlığının yeni, ardıcıl layihələrlə təkmilləşməsinin əsasını qoyub.

Akademik Ə.T.Əmiraslanov 500-ə qədər elmi əsərin müəllifidir. Onun əsərlərinin böyük əksəriyyəti dünyanın bir çox ölkələrinin nüfuzlu jurnal, toplu və məcmuələrində nəşr edilib. Əsərlərindən 18 – i monoqrafiya, 16 – sı ixtira və səmərələşdirici təkliflər, 31 – i dərslik, dərs vəsaiti və metodik ədəbiyyatdır. O, həmçinin onlarla elmi – kütləvi məqalələrin və görkəmli şəxsiyyətlərin həyat və yaradıcılığından bəhs edən məqalələrin müəllifidir. Akademik Ə.T. Əmiraslanovun «Onkologiya» adlı ilk orijinal dərsliyi azərbaycanlı tələbələr üçün əvəzsiz töhfə olub və onların, eləcə də həkimlərin, aspirantların stolüstü kitabına çevrilib. Onun 1995 – ci ildə Ankarada çapdan çıxan «Bədxassəli sümük şişlərinin proqnozu», 1999 – cu ildə çap olunan «Onkoloji kaxeksiya» adlı monoqrafiyaları da geniş oxucu kütləsi tərəfindən rəğbətlə qarşılanıb. Alimin «Mədə və qida borusu xərçəngi olan xəstələrdə kaxeksiya» adlı kitabı həm rus, həm də ingilis dillərində Türkiyədə nəfis şəkildə çap olunub və dünya oxucularının istifadəsinə verilib. Bunlardan əlavə 1987 – ci ildə Nyu – Yorkda, 1989 – cu ildə Tokioda müvafiq olaraq dünyanın məşhur onkoloqlarından W.F.Enneking və T.Yamamura kimi görkəmli alimlərin redaktorluğu ilə çap olunan sanballı rəhbərliklərin hər birinin böyük bir bölməsində Azərbaycan alimi

Ə.T.Əmiraslanovun onkologiyanın müasir problemlərinə dair ümumiləşmiş işlərinin dəyərli nəticələrini əks etdirən yazılara geniş yer verilib.

Akademik Ə.T.Əmiraslanov elmi – pedaqoji kadrların hazırlanması məsələsinə xüsusi diqqət yetirir və bu sahədə də məhsuldar çalışaraq öz yetişdirmələrinə tələbkarlığı bir an belə azaltmadan, böyük qayğı, yüksək həssaslıqla yanaşır. Əhliman Əmiraslanov məktəbinin yetişdirmələri nəinki Azərbaycanın, eləcə də keçmiş SSR-nin müxtəlif klinikalarında çalışaraq, onun yolunu davam etdirirlər. Ə.T.Əmiraslanovun bilavasitə rəhbərliyi altında 48 nəfər dissertasiya müdafiə edib və onlardan da 38 nəfəri tibb elmləri namizədi, 10 nəfəri tibb elmləri doktoru elmi dərəcəsinə layiq görülüb.

Görkəmli alim «Azərbaycan Tibb Jurnalının» və «Sağlamlıq» jurnalının redaksiya heyətinin üzvüdür. O, ATU- nun «Təbib» nəşriyyatının yaradıcılarından biri kimi geniş diapazonlu nəşriyyat işlərinin həyata keçirilməsində aktiv rol oynayır.

Akademik Ə.T.Əmiraslanov Ümumdünya Ortoped – Travmatoloq və Onkoloqlar Assosiasiyalarının, Yunanıstan, Çexiya, Macarıstan Onkoloqlar Cəmiyyətlərinin, Avropa Bərpa Cərrahlığı Assosiasiyasının üzvü, Amerika Kliniki Onkoloqlar Cəmiyyətinin, Azərbaycan Milli Elmlər Akademiyasının, Rusiya Təbiət Elmləri Akademiyasının, Rusiya Tibb Elmləri Akademiyasının, Polşa Tibb Elmləri Akademiyasının həqiqi üzvüdür.

Onun şəxsi fədakarlığı və beynəlxalq əlaqələr prosesində həyata keçirdiyi aktiv fəaliyyəti nəticəsində 1996 – cı ildə keçmiş SSRİ–nin bir çox respublikalarının, o cümlədən Qafqaz Respublikalarının ali tibb məktəbləri sırasında yalnız Azərbaycan Tibb Universiteti Londonda çapdan çıxan Amerika və Avropa Təhsil Birliyinin Beynəlxalq reyestrinə, 1998 – ci ildə isə Qara dəniz hövzəsiətrafı ölkələrin Ali Məktəblər Birliyinə daxil edilib, 2000-ci ildə Beynəlxalq Ali Məktəblər Assosiasiyasının, 2002 – ci ildə Avropa Universitetlər Assosiasiyasının tamhüquqlu üzvü seçilib ki, bu da ATU – nun və bütövlükdə Azərbaycan tibb təhsili sisteminin Beynəlxalq miqyasda geniş nüfuz qazanmasına, həmçinin diplomların qarşılıqlı tanınmasına əhəmiyyətli dərəcədə zəmin yaradan mühüm amilə çevrilib.

Akademik Ə.T.Əmiraslanovun 1995 – ci ildə Azərbaycan Respublikasının Prezidenti ulu öndər Heydər Əliyevin şəxsi dəvəti ilə Bakıya gələn və həmin ilin aprel ayında anadan olmasının 80 – illik yubileyi Azərbaycanda da qeyd olunan Türkiyənin və bütün Türk Dünyasının böyük alimi Prof.Dr.İhsan Doğramacının yubiley gecəsindəki çıxışı yaddaşlara daimi həkk olunan tarixi hadisəyə çevrildi.

Alimin xeyirxahlığı və qayğıkeşliyi, insansevərliyi və vətənpərvərliyi dövlətimiz və xalqımız tərəfindən yüksək qiymətləndirilib. O, 1990 – cı ildə 12 – ci çağırış

Azərbaycan SSR Ali Sovetinin deputatı (Millət vəkili) seçilib. Bu müddətdə dövlət səviyyəli nümayəndəliklərin tərkibində bir sıra xarici ölkələrdə olub, Azərbaycanın mənafeyini müdafiə edən siyasi məsələlərin müzakirəsində, ərazi bütövlüyümüz, müstəqilliyimiz və dövlətçiliyimizin qorunmasında fəal iştirak edib. O, həmçinin Müstəqil Dövlətlər Birliyinin iştirakçı dövlətlərinin Parlamentlərarası Assambleya Şurasının üzvü kimi də fəaliyyət göstərib.

Akademik Ə.T.Əmiraslanov onkoloji xəstəliklərin diaqnostikası, profilaktikası, müalicəsi, reabilitasiyası və alınan nəticələrin praktikaya tətbiqi üzrə bir sıra tibbi – bioloji texnologiyanın müəllifidir və o, Azərbaycan tibb elmini dünya miqyasında ləyaqətlə təmsil edir.

Ə.T.Əmiraslanov 1998 – ci ilin yanvarında aparılan sorğuya əsasən «1997 – ci ilin elm adamı» fəxri adına layiq görülüb.1998 – ci ildə onun adı dünya tibb elminə verdiyi dəyərli töhfələrə görə Kembricdə çapdan çıxan «XX əsrin 2000 görkəmli şəxsiyyəti» məcmuəsinnin əsas hissəsinə daxil edilib, elə həmin ildə tibb elminin, tibb təhsili sisteminin inkişafı yolunda, eləcə də onkologiya sahəsində əldə etdiyi nailiyyətlərin səhiyyə praktikasında geniş tətbiqi yolunda qazanılan yüksək nəticələrə görə Amerika Bioqrafiya İnstitutunun «Qızıl Statuya» mükafatına, 1999- cu ildə isə Polşa Tibb Elmləri Akademiyasının Albert Şvaytzer adına mükafata və Böyük qızıl medalına layiq görülüb.

Akademik Ə.T. Əmiraslanov 1999 – cu ildə UNESKO – nun «Bioetika, Elm və Texnologiyaların Etikası» üzrə Azərbaycan Milli Komitəsinin sədr müavini seçilib, 2000 – ci ildə Azərbaycan Respublikasının «Şöhrət» ordeni ilə təltif olunub, 2001 – ci ildə Rusiya Tibb Elmləri Akademiyasının və Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) həqiqi üzvü və AMEA-nın Biologiya Elmləri Bölməsinin akademik – katibinin müavini seçilib, 2006 – cı ildən UNESKO – nun «Bioetika, elmi biliklərin və texnologiyaların etikası» Komitəsinin Rəyasət Heyətinin üzvüdür, UNESKO-nun ekspertidir. O, 2007 – ci ildə Azərbaycan Milli Elmlər Akademiyasının Biologiya və Tibb Elmləri Bölməsinin akademik- katibi seçilib. Akademik Ə.T Əmiraslanov 2007 – ci ildə RTEA – nın akademik N.N. Bloxin adına qızıl medalına, 2009 – cu ildə Rusiyanın «XXI yüzilliyin liderləri» proqramı çərçivəsində «Millətin intellekti» adlı beynəlxalq təltifə layiq görülüb, 2010 – cu ilin aprel ayının 30 – da ölkə Prezidentinin Sərəncamına əsasən akademik Ə.T. Əmiraslanovun adı Azərbaycan Respublikasının Prezidenti yanında Elmin İnkişafı Fondunun Himayədarları Şurasının, Azərbaycan Respublikası Dövlət Mükafatlarının verilməsi üzrə Komissiyanın, həmçinin «Azərbaycan Respublikası Milli Atlası»nın tərtibi üzrə redaksiya heyətinin üzvləri siyahısına salınıb, 2010-cu ildə IV çağırış,

2015-ci ildə V çağırış Azərbaycan Respublikası Milli Məclisin deputatı seçilib. O, 2011 – ci ildə Avropa Tibbi -Onkologiya Cəmiyyətinin həqiqi üzvü və Dünya Azərbaycanlılarının III qurultayında Dünya Azərbaycanlılarının Əlaqələndirmə Şurasının üzvü seçilib. Türk PA-nın sədridir.

Akademik Ə.T.Əmiraslanov 2014-cü il iyulun 18-də Prezidentin Sərəncamı ilə Azərbaycan Respublikasının Prezidenti yanında Bilik Fondunun Himayəçilik Şurasının üzvü, 2015-ci il noyabrın 25-də isə Azərbaycan Respublikası Milli Məclisinin Səhiyyə Komitəsinin sədri, 29 iyun 2016-cı ildə isə UNESKO – nun «Bioetika, Elm və Texnologiyaların Etikası» üzrə Azərbaycan Milli Komitəsinin sədri seçilib.

Evlidir, iki oğlu var.